Wikipedia

# Aya Sofya

Vikipediya, azad ensiklopediya



**Bu məqalənin bəzi məlumatlarının mənbəsi göstərilməmişdir.**
Daha ətraflı məlumat üçün məqalənin müzakirə səhifəsinə baxa və məqaləyə uyğun formada mənbələr əlavə edib Vikipediyanı zənginləşdirə bilərsiniz.

**Aya Sofya** (yun. Αγία Σοφία, türk. *Ayasofya*) — Türkiyənin İstanbul şəhərində yerləşən, əvvəl provoslav kilsəsi, daha sonra məscidə çevrilən məbəd. Qısa müddət muzey kimi istifadə olunub. Bizans dövrünə aid olan Aya Sofya Bizansın "qızıl əsrinin" simvoludur. Hazırda rəsmi olaraq **Ayasofya Böyük Məscidi** (türk. *Ayasofya-i Kebir Camii*) adlanır.

**Aya Sofya**

türk. *Ayasofya*
yun. Ἁγία Σοφία
lat. *Sancta Sophia*



41°00′30″ şm. e. 28°58′47″ ş. u.

| | |
|---|---|
| **Ölkə** | Türkiyə |
| **Şəhər** | İstanbul |
| **Yerləşir** | Fateh, İstanbul |
| **Aidiyyatı** | 537-1204 - Yunan Ortodoks Kilsəsi<br>1204-1261 - Katolik kilsəsi<br>1261-1453 - Yunan Pravoslav Kilsəsi<br>1453-1934 - İmperiya məscidi<br>1934-2020 - Muzey<br>2020-hal-hazırda - Məscid |
| **Memar** | Trallı Anfimi<br>Miletli İsidor<br>Memar Trdat |
| **Sifarişçi** | I Yustinian |
| **Əsas tarixlər** | 324 - Konstantinin bazilikası<br>415 - Feodosinin bazilikası<br>537 - Yustinianın bazilikası |

## Mündəricat


**Ümumi məlumat**

**Tarixi**

**Ümumi mənzərəsi**

**Həmçinin bax**

**Xarici keçidlər**


## Ümumi məlumat

1935-ci ildən indiyə qədər muzey kimi fəaliyyət göstərən Aya Sofya Bizansa şahidlik edib, Osmanlı dövrünün möhtəşəm və tarixi abidələrindən biri olaraq il boyunca bütün ölkələrdən gələn turistlər tərəfindən ziyarət edilir. Zamana meydan oxuyan nəhəng ölçüdə, iqlim şərtləri, zələzələlər kimi təsirlərlə yaranan aşınmaların günümüzdə çox incə və ehtiyatlı halda aparılan bərpa işləri ilə aradan qaldırılmasına çalışılır.

## Tarixi

İnşasına 532-ci ildə başlanan Aya Sofyanın tikintisi üçün Efesdəki Diana məbədindən qırmızı porfir sütunlardan səkkiz ədəd gətirilib istifadə olunmuş,

dünyanın məşhur mərmər mədənlərindən də bura materiallar daşınmışdır. Xüsusən də Əyriboğaz adasından açıq yaşıl, Əlcəzairdən sarı rəngli, Siqadan çəhrayı, cənub-qərbi Anadoludan ağ qırmızı mərmərlər gətirilərək tikintdə istifadə edilmişdir. Gündə min usta və on min işçinin çalşması ilə 5 il 11 ay 10 günə inşaat başa çatmışdır. Aya Sofya müxtəlif dövrlərdə böyük təhlükələrlə qarşılaşmış, hündürlüyü 55,60 metr, eni 31,36 metr olan dövrün möcüzəsi kimi qiymətləndirilən qübbəsi genişliyi 1,1 metr olan 40 dirəyə söykənmişdir. Abidənin ağırlığını 40-ı aşağıda, 67-si yuxarıda olmaqla 107 sütun saxlayır, açılan 40 pəncərə onun bol işıq almasına səbəb olur. 2020-ci ildə Aya Sofyanın muzeydən məscidə çevrilməsi ilə bağlı qərar verilib. Abidəyə giriş ödənişli olması artıq ləğv edilib və bundan sonra da Aya Sofya bütün dinlərdən olan insanlar üçün hər zaman açıq olacaq.[1]

## Ümumi mənzərəsi

Aya Sofya muzeyi Sultanəhməd meydanını dövrəyə alan Sultan Əhməd məscidi, Yerəbatan qəsri, Aya İrini kilsəsi, III Əhməd çeşməsi, Soyuq Çeşmə küçəsi arasında yerləşir.

Aya Sofya ətrafında aparılmış qazıntı işləri zamanı tapılmış Bizans sütunlarından nümunələr nümayiş etdirilən baxçadan keçib tikiliyə daxil olanları qapı üzərində görkəmli mozaikalar qarşılayarkən, sola ayrılan daş döşəməli rampa döngələrlə ilə ziyarətçiləri üstədəki qalereyaya aparır. Üst qatın sol tərəfində irəliləyənlər sərgi bölümünü, Aya Sofya qübbəsindən özülünə doğru ana məkanı seyr etmək imkanı əldə edir və Mustafa İzzət xətti Allah, Məhəmməd, Osman, Əbu Bəkr, Ömər, Həsən, Hüseyn lövhələri daha yaxından görünür. Üst qalereya çıxışının sağ tərəfində gəzməyə davam edənlər tavanı bəzənmiş uzun bir dəhlizdə irəliləyərək Cənub Qalereyasında yerləşən Mərmər Qapıya gəlib çıxırlar. Bu qapı girişinin sağında tavana yaxın bölümdə Deisis mozaikası yer alır. Bu kompozisiyada İsa, Məryəm və Vaftizçi İohan ilə birlikdə görülür.

Eyni qalereya ilə irəlilədikcə pəncərəyə yaxın bölümdə 4 xaçlı rəhbəri cərgəsində İstanbula gələn və burada vəfat edən latın mənşəli komandir "Henrikus Dandol"nın məzarı yerləşir. Cənub qalereyasının sonunda rast gəlinən divarda Məryəm, balaca İsa, imperator İoannes və imperatiriça Eirene (12-ci yüz il) mozaikası, Şimal qalereyasında imperator İsgəndərin mozaikası görülür. Ayasofya bölmələrində Bizansda ilk dövrə məxsus həndəsə və flora

| | |
|---|---|
| | (müasir bina)<br>989 - Gümbəzi dağılıb<br>994 - Gümbəzi bərpa edilib<br>1453 - Məscidə çevrilib<br>1934 - Muzeyə çevrilib<br>2020 - Məscidə çevrilib |
| **Tikilmə tarixi** | 532-537 |
| **Üslubu** | Bizans memarlığı |
| **Uzunluğu** | 82 m (269 ft) |
| **Eni** | 73 m (240 ft) |
| **Minarələri** | 4 |
| **Günbəzləri** | 1 |
| **Material** | ağ daş, kərpic |
| **Vəziyyəti** | stabil, məscid kimi istifadə olunur |
| **Rəsmi sayt** | muze.gen.tr/muze-... (https://muze.gen.tr/muze-detay/ayasofya) (ing.) |

**UNESCO Ümumdünya İrsi**

*Rəsmi adı: Historic Areas of Istanbul*

| | |
|---|---|
| **Tipi** | Mədəni |
| **Kriteriya** | i,ii,ii,iv |
| **Təyin edilib** | 1985 |
| **İstinad nöm.** | 356 (http://whc.unesco.org/en/list/356/) |
| **Dövlət** | Türkiyə |
| **Region** | Avropa |



mozaikalarının yerləşdiyi üst qalereyadan enərək ana sahəyə daxil oluruq.



Kilsənin *Britannika Ensiklopediyasında* nəşr edilmiş planı

 **Vikianbarda əlaqəli mediafayllar**

# Həmçinin bax

- Məscid

# Xarici keçidlər

- Ayasofya hakkında geniş bilgi (http://ansiklopedika.org/Ayasofya) (türk.)



**Türkiyə məscidləri**

| | |
|---|---|
| **Adana** | Adana Ulu məscidi • Adana Yeni məscidi • Xoşqədəm məscidi • Sabancı mərkəz məscidi • Yağ məscidi • 57-ci Alay Şəhidlər məscidi |
| **Ankara** | Arslanhane məscidi • Qocatəpə məscidi • Maltəpə məscidi • Məlikə Xatun məscidi |
| **Diyarbəkir** | Bəhram Paşa məscidi • Diyarbəkir Böyük Məscidi • Həzrəti Süleyman məscidi • Şeyx Məttar məscidi |
| **İstanbul** | Ərəb məscidi • Atik Əli Paşa məscidi • Atik Mustafa Paşa məscidi • Atik Validə məscidi • Bəyazid II məscidi • Bodrum məscidi • Dəftərdar məscidi • Dolmabaxça məscidi • Əski İmarət məscidi • Əyyub Sultan məscidi • Fateh məscidi • Fenari İsə məscidi • Firuz Ağa məscidi • Gül məscidi • Aya Sofya • Hirami Əhməd Paşa məscidi • İmrahor məscidi • Kalendarxana məscidi • Qara Əhməd Paşa məscidi • Qariyə məscidi • Kefeli məscidi • Kılıç Əli Paşa məscidi • Qoça Mustafa Paşa məscidi • Kiçik Məcidiyə məscidi • Laləli məscidi • Balaca Aya Sofya • Mihrimah məscidi (Ədirnəqapı) • Mihrimah məscidi (Üsküdar) • Molla Çələbi məscidi • əMəhəmməd Maarifi məscidi • Yeni məscid (İstanbul) • Nuruosmaniyə məscidi • Nüsrətiyə məscidi • Böyük Məcidiyə məscidi • Pertevniyal Validə Sultan məscidi • Rum Məhməd Paşa məscidi • Rüstəm Paşa məscidi • Şakirin məscidi • Sancaqtar Hayrettin məscidi • |







